**UOT: 634/1/7:633.635.631.52**

# ALMANIN SELEKSİYASINDA QİYMƏTLİ GÖSTƏRİCİLƏRƏ MALİK BAŞLANĞIC MATERİALININ SEÇİLMƏSİ

**Ə.N.SADIQOV**
**AKTN Meyvəçilik və Çayçılıq Elmi Tədqiqat İnstitutu**

*Məqalədə, Azərbaycanda almanın seleksiyası üzrə1985-2016-cı illərə dair seleksiya sortlarının əldə edilməsi üçün başlanğıc materialından və yeni seleksiya sortlarının keyfiyyət göstəricilərindən məlumat verilir.*

***Açar sözlər:*** *Alma, genefond, valideyn cütləri, seleksiya, sort.*

Azərbaycan respublikasında 4500 ali bitki qeydə alınmışdır ki, bu da Qafqaz florasının 65 %-ni, dünya florasının isə 11 %-ni təşkil etməkdədir (1). Azərbaycan biomüxtəlifliyin çox zəngin olduğu bir ərazi olmaqla, həmdə bir sıra mədəni bitkilərin, o cümlədən meyvə bitkilərinin əmələ gəlmə mərkəzlərindən biridir. Meyvə bitkiləri içərisində yayılma arealına görə alma bitkisi birinci yeri tutmaqdadır (2). Aparılmış elmi tədqiqat işlərinin nəticələrinə görə almanın bir-birindən fərqlənən 25 növü vardır. Bunlardan təsərrüfat əhəmiyyətli növləri olan:- Meşə alması (Malus sylvestrus Mill), Tüklü alma (Malus syphylla Borsk), Alçaq boylu alma (Malus pymila Mill), Gavalı yarpaq alma, yaxud Çin alması (Malus pruni falia Borsk (3), Sibir giləmeyvə alması (Malus Bassata Borskh).

Hal-hazırda respublikamızın alma bağlarında vaxtaşırı ekspedisiyalarda olar kənalmanın çoxlu saylı forma və sortları aşkar edilmişdir. Bunlar əsasən xalq seleksiyası yolu ilə seçilmiş, əvvəllər introduksiya edilmiş, Meyvəçilik və Çayçılıq Elmi-Tədqiqat İnstitutunun seleksiya yolu ilə əldə edilmiş və son 25-40 ildə introduksiya edilmiş sortlar təşkil edir (4).

Tədqiqat illərində (1985-2016-cı illər) Azərbaycanın meyvəçilik bölgələrində ekspedisiyalarda olarkən almanın genefondu öyrənilmiş, aşkar edilmiş sortlar üzərində tədqiqat işləri aparılaraq yüksək genetik xüsusiyyətlərə malik yerli sortlardan: Cırhacı, Sarı Turş, Qızıl Əhmədi, Əyyubi, Qışlıq Qırmızı Cibir; əvvəllər introduksiya edilmiş sortlardan: Şampan reneti, Simirenko reneti, Sosikoli reneti; Son 25-40 ildə introduksiya edilmiş sortlardan:- Qolden Delişes, Qolden Spur, Starkrimson və s. sortlarından ata valideyin, Meyvəçilik və Çayçılıq Elmi-Tədqiqat İnstitutu sortlarından:- Təravətli, Quba Reneti, Şahdağ, Neftçilərə Hədiyyə, Şirvan Tacı, Fəhimə sortlartından təkrar hibridləşmədə ($F_2$-də) ana valideyn cütləri kimi istifadə olunaraq, yüksək əmtəəlik xüsusiyyətlərə malik, tez məhsula düşən, “Spur” tipli, bazar iqtisadiyyatının tələblərinə cavab verən:- Çıraqqala, Davamlı, Emil, Elvin, Marfa, Nigar, Payızlıq Quba, Qışlıq Quba, Sevinc, Sülh, Şabran, Qobustan, Zümrüd, Qızıl Tac, Xəzər, Eldar, Nuran, Sarvan, Ülvi, Nübar, Vətən, Məxməri, Sədəf sortları əldə edilmişdir. Sortlar (Sədəf sortu istisna olmaqla) Seleksiya Naliyyətlərinin Sınağı və Mühafizəsi Üzrə Dövlət Komissiyasına təqdim edilmiş, Payızlıq Quba, Qışlıq Quba, Sevinc, Elvin sortları isə rayonlaşdırılmışdır.

**Material və metodika**: Tədqiqat işi əsasən Azərbaycanın əsas meyvəçilik bölgəsi sayılan Quba-Xaçmaz qrup rayonlarının ərazisində yerli, introduksiya edilmiş və Meyvəçilik və Çayçılıq ETİ-nin seleksiya ($F_2$-də) sortlarından istifadə edilmişdir.

Tədqiqatın yerinə yetirilməsində N.İ.Vavilov adına ÜBİ-nin metodikasına (1970), “Meyvə bitkilərinin introduksiyasına və sortöyrənilməsinə dair proqram” (1972), Q.A. Lobanovun, A.S.Morozovun və b. “Meyvə, giləmeyvə və qərzəkli bitkilərin proqramı və metodikası” (1973), A.S.Tatarintsevanın “Meyvə, giləmeyvə bitkilərinin seleksiyası və sortöyrənilməsi” (1981) və s. qeyd olunan metodikalardan istifadə edilməklə yerinə yetirilmişdir.

**Tədqiqatın nəticələri və müzakirəsi**: Süni seleksiya yolu ilə əldə edilmiş sortlar bir sıra kəmiyyət göstəricilərinə görə mövcud sortları təxminən 10-12 % üstələmişdir. Əldə edilmiş sortlar yetişmə müddətinə görə yaylıq, payızlıq və qışlıq qruplarına bölünməklə, meyvələrinin rəngləri və formaları sorta məxsus xarakterik olub, tamları əsasən turşa-şirindir. Dequstasiya qiymətləri 4,0-5,0 ball, Davamlı, Emil, Elvin, Marfa, Sevinc, Sülh, Qızıl tac, Nübar, Vətən sortları 5 balla, digər sortlar isə 4,0-4,9 balla qiymətləndirilmişdir. Sortlara məxsus meyvələrin orta kütləsi 137-176 q, maksimum kütlələri isə 142-184 q həddində fərqlənmişlər. Sülh, Xəzər, Payızlıq Quba, Qışlıq Quba, Məxməri sortlarında bir meyvənin orta kütləsi 165-176 q, həmin sortlarda maksimum kütlələri isə 173-184 q olduğu halda digər sortlarda həmin göstərici 137-159 q və yaxud 145-168 q olmuşdur.

.

**Yeni seleksiya alma sortlarının meyvələrinin keyfiyyət göstəriciləri**

| S o r t | Meyvələrin müqayisəli xarakteristikası | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | yetişməsi | rəngi | forması | tamı | dequstasiya qiyməti 5 balla | kütləsi, q | | vitamin "C" mq %-lə | qalma müddəti | |
| | | | | | | orta | maksi-mum | | təbii itki %-lə | günlə |
| Çıraqqala | Qışlıq | Göyümtül-sarı | Yastı-girdə | Turş | 4,1 | 154 | 160 | 4,64 | 10,2 | 141±8,86 |
| Davamlı | __"__ | Sarımtıl | Girdə-silindirik | Turşa-şirin | 5,0 | 150 | 154 | 3,51 | 10,2 | 150±5,11 |
| Emil | __"__ | Yaşılımtıl | Girdə | Turşməzə | 5,0 | 153 | 155 | 5,41 | 11,1 | 126±9,55 |
| Elvin | __"__ | Sarı, güney tərəfi qır. | Yumurtavari | Turşa-şirin | 5,0 | 155 | 161 | 5,54 | 10,5 | 145±14,6 |
| Marfa | Payızlıq | Göyümtül çəhrayı | Girdə | Turşaməzə | 5,0 | 160 | 163 | 4,41 | 10,6 | 101±5,79 |
| Nigar | Yaylıq | Qırmızımtıl | Girdə | Turşməzə | 4,2 | 138 | 139 | 3,91 | 12,0 | 41±2,14 |
| Payızlıq Quba | Payızlıq | Yaşıl | Yastı-girdə | Şirin | 4,0 | 164 | 168 | 3,56 | 11,3 | 111±10,57 |
| Qışlıq Quba | Qışlıq | Göyümtül çəhrayı | Yastı-girdə | Turş | 4,2 | 160 | 179 | 3,94 | 10,8 | 145±5,11 |
| Sevinc | __"__ | Göyümtül-qırmızı | Yastı-girdə | Turşa-şirin | 5,0 | 148 | 158 | 5,443 | 10,8 | 160±5,11 |
| Sülh | Payızlıq | Sarımtıl-yaşıl | Yastı-girdə | Turş | 5,0 | 176 | 184 | 4,51 | 11,2 | 117±7,16 |
| Şabran | Qışlıq | Göyümtül -yaşıl | Yastı-girdə | Turşa-şirin | 4,2 | 137 | 142 | 4,61 | 10,6 | 134±11,94 |
| Qobustan | Qışlıq | Sarımtıl -yaşıl | Girdə-silindirik | Turşa-şirin | 4,8 | 159 | 165 | 6,21 | 10,1 | 145±5,11 |
| Zümrüd | __"__ | Qırmızımtıl, yaşıl, ağ nöqtəli | Girdə-yastı | Şirin | 4,5 | 155 | 166 | 5,51 | 10,3 | 135±4,43 |
| Qızıl Tac | __"__ | Tünd-qırmızı, qabıqaltı, nöqtəli | Yastı-girdə | Turşa-şirin | 5,0 | 159 | 168 | 5,64 | 9,7 | 131±14,67 |
| Xəzər | __"__ | Sarımtıl-qırmızı | Girdə-silindirik | Şirin | 4,4 | 166 | 174 | 4,51 | 10,0 | 126±9,55 |
| Eldar | __"__ | Sarımtıl, işıqlı ağ nöq | Geniş silindrik | Turşa-şirin | 4,8 | 141 | 151 | 3,56 | 10,4 | 160±5,45 |
| Ülvi | __"__ | Sarımtıl | Silindrik | Turşa-şirin | 4,9 | 138 | 149 | 6,41 | 10,5 | 160±5,45 |
| Nübar | __"__ | Sarımtıl-qırmızı | Girdə-silindirik | Turşa-şirin | 5,0 | 137 | 145 | 4,51 | 10,3 | 126±9,55 |
| Vətən | __"__ | Qırmızımtıl, güney tərəfi qırmızı | Yastı-girdə | Turşa-şirin | 5,0 | 145 | 155 | 4,61 | 9,9 | 131±14,67 |
| Məxməri | __"__ | Qırmızımtıl ağ nöqtəli | Girdə | Şirin | 4,0 | 165 | 173 | 6,51 | 10,1 | 160±5,45 |
| Nuran | __"__ | Yaşıl-sarı, güney tərəfi qırmızı | Girdə-konusvar | Turşa-şirin | 4,2 | 145 | 153 | 5,41 | 10,7 | 150±5,11 |
| Sarvan | __"__ | Sarımtıl güney tərəfi ağ nöqtəli | Konusvari | Turşa-şirin | 4,7 | 154 | 166 | 5,51 | 10,1 | 160±5,45 |
| Sədəf | __"__ | Qırmızı | Konusvari | Turşa-şirin | 4,9 | 145 | 150 | 5,54 | 10,2 | 160±5,45 |

Vitamin "C"-nin miqdarı 3,51-5,54 mq %, Elvin, Emil, Sevinc, Qızıl Tac, Nübar, Vətən sortlarında, 5-5,54 mq %, digər sortlarda isə 3,51-4,61 mq % olduğu aşkar olunmuşdur. Sortlarda qalma müddəti yaylıq sortlarda 41 gün (təbii itki 12 %), payızlıq sortlarda 101-117 gün (təbii itki 11,2-11,3 %), qışlıq sortlarda isə 134-160 gün (təbii itki 10,1-10,6 %) adi otaq şəraitində qalmışdır. Həmin otaqda meyvələr orta sutqalıq temperaturda + 15+8$^0$C saxlanılmışdır (cədvəl 1).

### Nəticə

-Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyi Meyvəçilik və Çayçılıq Elmi-Tədqiqat İnstitutunda almanın seleksiyası üzrə elmi-tədqiqat işinə 1932-ci ildən başlanılmış, 1985-ci ildən tərəfimizdən davam etdirilmişdir. Tədqiqat illərində Azərbaycanın meyvəçilik bölgələrində ekspedisiyada olunaraq almanın genefonduna dair tədqiqat işləri aparılmışdır.

-Azərbaycanda almanın 25-dən artıq sortları yayılmışdır ki, bunlar da xalq seleksiyası yolu ilə seçilmiş, əvvəllər introduksiya edilmiş Meyvəçilik və çayçılıq ETİ-nin seleksiya yolu ilə əldə edilmiş və son 25-40 ildə yeni introduksiya edilmiş sortlarıdır.

-Almanın genefonduna məxsus sortların aqrobioloji xüsusiyyətləri öyrənilmiş, seleksiya məqsədi üçün qiymətləndirilmiş və yeni sortların yaradılmasında valideyn cütləri kimi istifadə edilmişdir.

-Hal-hazırda həmin sortlar (Sədəf sortu müstəsna olmaqla) digər sortlar Seleksiya Nailiyyətlərinin Slnağı və Mühafizəsi üzrə Dövlət Komissiyasına təqdim edilmiş, Payızlıq Quba, Qışlıq Quba, Sevinc və Elvin sortları rayonlaşdırılmışdır.

-Rayonlaşdırılmış sortlar hal-hazırda Dövlət və kəndli (fermer) təsərrüfatlarında tətbiq edilməkdədir.

### ƏDƏBİYYAT

1. Musayev Ə.C.- Seleksiya prosesində genefondun istifadəsinin bəzi aspektləri I Beynəlxalq Elmi konfransın "Biomüxtəlifliyin genetik ehtiyatları". Bakı 2006. s. 18-19. 2. Sadıqov Ə.N.-Azərbaycanda alma bitkisi. Bakı. 2005. s.174. 3. Axundzadə İ.M.- Azərbaycanda kol alması. Bakı 1950., s. 24. 4.Sadıqov Ə.N.- Azərbaycan Respublikasının Quba-Xaçmaz bölgəsində alma sortlarının öyrənilməsi və seleksiyası. Dokt.diss avtoreferat. Bakı.2015. s.42.

### Выделение ценного исходного материала в селекции яблони

**Е.С.Садыгов**

В статье изложены сведения об исходном материале для селекции яблони в Азербайджане за период 1986-2016 гг., а также о качественных показателях новых селекционных сортов яблони.

***Ключевые слова****: генофонд, яблоня, селекция, сорт, исходный материал.*

### Selection of valuable starting material for apple selection

**E.N.Sadigov**

Ministry of Agriculture of The Republic of Azerbajian Fruit and Tea Research Scientific Research Institute

The article provides information on the 1985-2016 years selection of apple quality indicators of new selection varieties and the starting material for the selection of varieties.

***Key words :*** *Apple, Genefond, Parent pair, Selection, Sort*